Telman İbrahimov
Azərbaycan Milli Elmlər Akademiyası

# NOVRUZ BAYRAMINDA BALIQ - DİRÇƏLİŞİN, RUZİ-BƏRƏKƏTİN SİMVOLUDU

## NƏ ÜÇÜN BALIQ ?

1. Novruz bayramında yazın gəlməsi ilə təbiətin dirçəlişinə sevinmək, ona dəstək vermək - ibtidai dövrün fəsil bayramlarının yadigardır.

Qədim Şərq (Sumer, Babil) sivilizasiyasında da yazın gəlişi ilə həyatın dirçəlməsi mistik "Ölən və dirilən" tanrı qismində "Yeni il" bayramında ruzi-bərəkət simvollarından biri kimi çıxış edib.

"Dirilik suyu"nu və məhsuldarlığı özündə birləşdirən "Balıq-İnsan" tanrısı - qədim Mesopotamiyada Yeni il bayramlarında ruzi-bərəkət simvolu kimi istifadə olunub.

İslamın yayılması ilə yaz bayramının qeyd olunması xalq mərasimlərindən yox olmur və yeni din bu bayrama yeni kontekst verir. Təbiətdə baş verən dövri "ölüb-dirilmə" birmənalı olaraq Allahın hökmü ilə əlaqələndirilir. Lakin, Quran və Hədislərdə təbiətin dirçəlməsində Xızr Peyğəmbərin iştirakı məcazi işarələndirilir. Xızr sözünün(ərəbcə) mənası – yaşıl deməkdir və İmam Əl-Buxarinin Hədisinə əsasən, Peyğəmbərimiz deyib: " Allahın qulu(Xızr nəzərdə tutulur) olduğu yer yaşıllaşır".

2. **Xızrın dirçəliş simvolları - dirilik suyu və balıq**. Quranda Əl-Kəhf (Mağara 18.60-68) surəsində Musa Peyğəmbər gənc Yuşə İbn Nun ilə Xızr Peyğəmbəri tapmaq üçün səyahətə çıxırlar. Səyyahlar iki dənizin qovuşacağına çatdıqda, özləri ilə səyahət zamanı nahar etmək üçün götürdikləri quru balıq qəflətən dirilir, özünü suya ataraq, dənizə tərəf üzür. Bundan xəbər tutmayan səyyahlar yollarını davam edirlər. "Onlar iki dənizin qovuşduğu yerdən keçib getdikləri zaman Musa gənc dostuna dedi: "Nahar yeməyimizi gətir. Bu səfər bizi lap əldən saldı" Balığın yox olmasını gördikdə onlar İki dənizin qovuşduğu yerə qayıdaraq, orada Xızrı tapırlar (Quran 18.65). Bir çox Təfsirlərə əsasən, Quranın bu ayəsində Xızra Allah tərəfindən əta olunmuş təbiəti canlandırmaq/diriltmək kəramətinin verilməsinə dair işarədi.

3. **Nizami Gəncəvinin "Xəmsə"**sində (İsgəndərnamə) Xızr, İlyas Peyğəmbər və İsgəndər Zülqərney də "dirilik/ölməzlik suyunu axtarırlar. Yolda bir çeşməyə çatdıqda, onun ətrafında oturaraq, özləri ilə gətirdikləri quru duzlanmış balığı yemək istərkən, balıq suya düşür və dərhal diriləρək üzüb gedir. Peyğəmbərlər çeşmənin "dirilik suyu" olmasını görərək, onun suyundan içib ölməzlik qazanırılar.

İsgəndər Zülqərneyn də onlarla birlikdə dirilik/ölməzlik suyunu axtarırdı😊. Amma, Peyğəmbərlər çeşməni tapan anda İsgəndər onu başqa səmtdə axtarırdı. Xızr və İlyas çeşmənin suyundan İsgəndər üçün qabla götürmək istədikdə - çeşmə qeyb olur. Ölməzlik İsgəndərin taleyində yox imiş.

Yaz vaxtında dirilik suyu vasitəsilə balıq üstündə gələn Xızr - təbiətin dirçəlişini rövnəqləndirəndir. İslami miniatürlərdə Xızr Peyğəmbər məhz balıq üstündə gələrkən təsvir olunurdu. Qədim Sumer mədəniyyətində yaranan "Balıq-İnsan" tanrısı – İslam kontekstində yaz vaxtı balıq üstündə gələn əbədi-yaşar mistik Xızr Peyğəmbərə çevrildi.

İslami cəmiyyətə adaptasiya olunmuş qədim Yeni il və Bahar bayramı süfrələrində balığın olması simvolik məna kəsb etmişdir. Cansız (bişmiş) balıq – həmin o nahar üçün hazırlanan "quru balığı", su qabının içində üzən canlı balıq isə, həmin o, artıq dirilmiş balığı simvolizə edir.

Daima qış fəsilində qeyb olaraq, yaz fəsilində zühur edən mistik Xızrın ruzi-bərəkət simvolu - balıqdı.



Xızr və İlyas peyğəmbər “Dirilik suyu” çeşməsini tapırlar
Nizami Gəncəvi “Xəmsə”(İsgəndərnamə). Teymurilər dövrü(15 ə. Sonu)
Herat, Əfqanıstan.
The Freer Gallery of Art, Smithsonian Institution

گذشت از بر خنگ صحرا نورد | همی داشت دیده بران آبخورد | که تا چون شد آمد بنوخندگی | نماید بدو چشمه زندگی



چو در چشمه یک چشم زد بنگرید
شد آن چشمه از چشم او ناپدید

ندانست خضر از سر آگهی | که اسکندر از چشمه ماند تهی | ز خرمی او شد از چشم او | نهان گشت آن چشمه از چشم او

درین داستان راویان کهن | بنوعی دگر رانده اند این سخن | که الیاس با خضر همراه بود | بران چشمه کو بر گذرگاه بود

چو با یکدگر هر دو آمدند | بران آب چشمه فرود آمدند | گشادند سفره بدان چشمه سار | که چشمه کند چشم خود آشکار

بران نان که بویاتر از مشک بود | نمک یافته ماهیی خشک بود | ز دست یکی زان دو فرخ جمال | در افتاد ماهی در آب زلال

بسنجیده در آب فیروزه رنگ | بپیچید تا ماهی آرد بچنگ | چو ماهی بچنگ اندرش زنده بود | پژوهنده را فال فرخنده بود

بدانست کان چشمه جان فزای | بآب حیوة اندرش رهنمای | بخورد آب حیوان بفرخندگی | بقای ابد یافت در زندگی

همان یار خود را خبردار کرد | که او نیز خورد آب آن آبخورد | شگفتی نشد کاب حیوان گهر | کند ماهی مرده را جانور

شگفتی در آن ماهی مرده بود | که بر چشمه زندگی ره نمود | ز ماهی آن آب گوهر فشان | دگر داد تاریخ تاری نشان

Qədim Sumerdə «Balıq-İnsan» tanrısı





İslami ənənədə
Xızr peyğəmbərin təsviri



